# HƏBİB İBN MƏZAHİR

CAVAD MÜHƏDDİSİ

# Mündəricat

Bəzən yarım günlük müqavimət və fədakarlıq əsrlər boyu şöləlValue tənib iftixar yaradır. .Aşura qəhrəmanlıq dastanı da bu qəbildəndir

Hüseyn (ə) yardımçılarının tarixi hərəkətə gətirmiş fədakarlığı, isarı və cihadı zərbül-məsələ çevrildi. Bu insanlar həyata və ölümə əzəmət vermək iftixarı qazandılar. Onların xatirəsi ilham mənbəyi, adları əzəmət simvolu oldu. Bu mücahidlər İslam .nihalını öz qanları ilə suvardılar, din və azadlığa ikinci həyat verdilər

Bəli, beləcə, ölümdən həyat zühur edir. Bu yolla fəna bəqa yaradır, şəhidin al qanı əbədi bir xatirə rəsmi çəkir, şəhidlər tarixin ideallarına çevrilir. Bəli, məhz bu insanlar dindarlıq, təqva, ilahi hökmlərə keşikçilik, Quran və imamın haqq və ədalətin müdafiəsi, azadlıq və haqtələblik, bir sözlə bütün fəzilətlərdə nümunəyə çevrilirlər. !Sözümüzün canı aşura, əməl meydanı isə Kərbəladır

İslam Peyğəmbərinin (s) vəfatından yarım əsr keçmiş hicri ۶۱-ci ildə İslam cəmiyyətinə dini təhrif edən, azadələri dara çəkən, ilahi hədləri pozan, cahiliyyət ənənələrini dirildən, dünyapərəst, zalım, qarınqulu insanlar hakim oldular. Amma bu sadalananlar .onların kiçik günahları idi

Bütün bu fəsadlara qarşı Hüseyn ibn Əli (ə) qiyam etdi. Onun məqsədi İslam ümmətini Yezid kimi günahkarın hakimiyyətindən qurtarmaq idi. Olduqca ağır bir zəmanə idi. Zaman insanları elə bir sınağa çəkirdi ki, bu sınaq qarşısında həqiqi dindarlar, mücahid kişilər az tapılırdı. İnsanların əksəri dünya həyatına üz tutmuşdu! İmam (ə) haqqı və İslamı dirçəltmək üçün öz möhkəm vəfalı haqtələb tərəfdarları ilə meydana qədəm qoyub, Yezidə qarşı qiyam qaldırdı. Onun səhabələri az idi. Amma aşura üçün mühüm olan kəmiyyət yox, keyfiyyət idi. Bu meydanda meyar imam və şəhadət eşqi sayılırdı. Belə bir meydanda cəmiyyətin çoxluğundan, saydan danışmağa dəyməzdi. Hüseyn ibn (Əlinin (ə

yoldaşlarının əksəriyyəti gecə ibadətinə məşğul olan abidlər, Quran qariləri, bəsirətli qəhrəmanlar, əli silahlı müəllimlər, təqvalı mücahidlər idi. Onların ibadət və təqvası simalarından görünürdü. İslam Peyğəmbərinin (s) səhabələrindən, həzrət Əlinin (ə) həvarilərindən bir qisminin imam Hüseyn (ə) qoşununda olması bu cəbhəyə xüsusi bir .mənəvi görkəm verirdi

Əlinizdəki kitabçada parlaq simalardan, tanınmış şəxsiyyətlərdən, qəhrəmanlıq dastanları yaradan şücaətli şirlərdən biri ilə tanış olacaqsınız. Olsun ki, bu tanışlıq böyük insanların yolunu izləməkdə bizə yardımçı olsun. Bu abid və arif qəhrəman Həbib ibn Məzahirdir. Bu ad sizlərə yaxşı tanışdır. O, Hüseyn (ə) Kərbəlası, şəhadət aşurası ilə qırılmaz əlaqələrə malikdir. Aşura hadisəsinin iştirakçılarından bəziləri hətta Həzrət Peyğəmbərin (s) hüzurunda olmaq iftixarına malik idilər. Bu qiyamın bəzi iştirakçıları isə həzrət Əli (ə) ilə çiyin-çiyinə həqiqət uğrunda

vuruşanlar idi. Bəziləri isə həm də imam Həsənin (ə) səhabəsi hesab olunurdu. Bu insanlar nəhayətdə Hüseyn ibn Əliyə (ə) Kərbəlada yardımçı olmuş və bu yolda .şəhadətə yetişmişdilər

Həbib ibn Məzahir və Hüseynin (ə) digər yoldaşlarının aşuradakı məqamı insanda qibtə doğurur. Bu barədə imam Sadiqin (ə) çox dəyərli buyuruqları var. İmam Sadiq (ə) həmin bu insanları «Allahın övliyaları və dostları», «Allahın seçilmişləri», «Allah dininin yardımçıları», «Peyğəmbər (s), Əli (ə), Fatimə, Həsən (ə), Hüseynin (ə) ənsarı», «Həqiqi (paklar» və bu kimi digər ləqəblərlə yad etmişdir.(١)

Özünüz deyin, İslam qədər insan sərmayəsinə malik olan məktəb, ayin, millət, irq !?varmı?! Hansı məsləkdə və dində bir bu qədər görkəmli şəxslər tapa bilərsiniz

Salam olsun belə bir mənəvi xəzinə sahibi olan İslama! Salam olsun İslam və Quranın keşiyində dayanmış bu pak səh:۶

---

.Biharul-ənvar» ۹۸-ci cild, səh.۲۰۱» [۱] -۱

.insanlara, əbədi şəhidlərə! Bu insanlar əsl nümunə, əsl ideallardır

Ümid etmək olar ki, bu ilahi nümunələr hamımız üçün İslam cəbhəsinin bütün döyüşçüləri üçün, dünyanın bütün azadələri üçün kamillik və fəzilət çeşməsi olsun. Ey kaş, Kərbəla yolları hamının üzünə açılsın və hər birimiz Hüseynin (ə) barigahı !kənarında onun vəfalı yardımçılarını da ziyarət edə bilək

## HƏBİB İBN MƏZAHİR ƏSƏDİ

Dini ömür tarixçəsi, İslama xidmət və İslam Peyğəmbərinin (s) hüzurunda olmaq iftixarı Həbib ibn Məzahirə məxsusdur. Həbib iftixar sahibi olan «Bəni Əsəd» tayfasının görkəmli şəxsiyyətlərindən-dir. O, İslam Peyğəmbərinin (s) besətindən bir il əvvəl dünyaya gəldi. İslam Peyğəmbəri (s) Məkkədə insanları tövhid dininə dəvət edərkən Həbib öz uşaqlıq dövrünü yaşayırdı. Amma o öz gəncliyini Mədinədə İslam Peyğəmbə- (rinin (s

.hakimiyyəti zamanında din yolunda cihad və fədakarlığa sərf etdi

Şübhəsiz ki, həzrət Peyğəmbərlə (s) görüşmək Allahın böyük bir lütfüdür. Həbib ibn Məzahir həzrətlə (s) görüş sayəsində elə əvvəlcədən dini maariflə, ilahi hikmətlərlə, İslamın əbədi təlimləri ilə tanış ola bildi. Həbib Peyğəmbərin (s) səhabələrindən sayılırdı. Onun dilindən bir sıra hədislər nəql olunmuşdur. Həbibin Peyğəmbər (s) səhabəsi olması onun məqamını bir xeyli ucaltmışdır. Bu insanın yetmiş beş yaşında ikən Kərbəla qiyamında iştirak etməsi, əlinə silah alaraq Hüseyn ibn Əlini (ə) müdafiə etməsi mənəviyyat dolu səhnələrindəndir. Belə bir mənəviyyatla yalnız haqpərəst .möminlərin nurani cəbhələrində rastlaşmaq olar

## ƏMİRƏL–MÖMİNİNİN (Ə) DÖVRÜNDƏ

Həzrət Peyğəmbərin (s) vəfatından sonra Həbib ibn Məzahir Əli ibn Əbi-Talibin vilayət (xəttini tutdu. O, həzrətin (ə) hüzurunu qənimət sayaraq, onu Peyğəmbər (s

elmlərinin varisi kimi tanıyırdı. Bu səbəbdən də həzrətə (ə) üz tutub, onun xüsusi həvarilərindən və şagirdlərindən olmuşdur. Həbib ibn Məzahir həzrət Əlinin (ə) dəyərli biliklərindən faydalanmış və onun elminin daşıyıcılarından olmuşdur.(۱) Həbib ibn Məzahir həzrətin (s) Meysəm Təmmar, Ruşid Hicri kimi fədakar yardımçılarının sırasındaydı. Həbib bir sıra ilahi bilgilərə yiyələnmişdi ki, bunlardan biri də gələcəkdə baş verəsi hadisələrin öncədən xəbər verilməsi idi. Həbib özünün və başqa-larının .şəhadətindən xəbərdar bir insan idi

Bu barədə nəql olunmuş məşhur nümunələrdən birinə nəzərə salaq: Bir gün Meysəm Təmmar süvari halda Bəni-Əsəd tayfasının toplaşdığı yerdən keçirdi. Bu vaxt o, Həbib ibn Məzahiri görür. Bu iki süvari bir-birinə o qədər yaxınlaşır ki, atların başları bir-birinə ,toxunur. Onlar uzun müddət söhbətləşirlər



---

.Səfinətul-bihar» ۱-ci cild, səh. ۴۰۵«) [۲] -۱

axırda Həbib ibn Məzahir Meysəmə deyir: «Sanki Peyğəmbərə (s) məhəbbət yolunda dara çəkilmiş, qarnı yırtılmış yemiş satan bir kişi görürəm!» (Meysəmin peşələrindən biri də yemiş satmaq idi). Onun cavabında Meysəm belə deyir: «Mən də Peyğəmbər (s) övladı Hüseyn (ə) ibn Əli yolunda öldürüləcək və başı kəsilib Kufəyə göndəriləcək kişini yaxşı tanıyıram!» Onlar beləcə söhbətləşib ayrılırlar. Onların söhbətlərini dinləyənlər hələ də öz aralarında mübahisə edir, Həbiblə Meysəmin söhbətlərinə şübhə ilə yanaşırlar. Bu vaxt Ruşeyd Hicri gəlib, Meysəmlə Həbibin harada olduğunu soruşur. Ona deyirlər: «Burada idilər, filan sözləri danışdılar, sonra ayrılıb getdilər». Ruşeyd deyir: «Allah Meysəmə rəhmət etsin. O bir şeyi deməyi unudub ki, Həbibin kəsilmiş başını Kufəyə gətirənə yüz dirhəm hədiyyə verərlər, sonra isə kəsilmiş başı şəhərdə gəzdirərlər!» Oradakılar bir-birinə deyirlər: «Deyəsən, bu bir nəfər o biri iki nəfərdən də yalançıdır». Amma çox keçmir

ki, Meysəmi dara çəkirlər və Həbib ibn Məzahirin də kəsilmiş başını Kufəyə gətirirlər. Bir zaman bu sözlərə şübhə edənlər deyilənlərə şahid olurlar.(١) Zaman ötdü və xilafət Əmirəl-mömininə (ə) çatdı. Həzrət (ə) xilafət mərkəzini Mədinədən Kufəyə köçürdü. .Həbib ibn Məzahir də Kufəyə köçdü ki, həmişə mövlası Əlinin (ə) yanında olsun

Həbib həzrət Əlinin (ə) bütün döyüşlə-rində iştirak etdi. Həmin vaxt o, Kufənin ən şücaətli insanlarından sayılırdı. Bu şücaətli kişi eyni zamanda gözəl əxlaq, dini biliklər, paklıq və təqva, səxavət və vəfa sahibi idi. Onu imam və Əhli-beytə (ə) ixlasda nümunə saymaq olardı. Onun fiqh, təfsir, qiraət, hədis, ədəbiyyat, cədəl, münazirə və digər sahədəki bilikləri bütün vaxtlarda ətrafdakıları heyran qoyardı. Həbib İmama (ə) .vəfadarlıqda ən öncül insanlardan sayılardı

Həbibin gözəl siması vardı. Onun mənəvi gözəlliyi də kamillik həddində səh:١١

---

.Səfinətul-bihar» ١-ci cild, səh.۴٠۵» [٣] -١

idi. Quranı bütünlüklə əzbər bilirdi və gecələr işa namazından fəcrədək Quranı xətm edər, ibadətə məşğul olardı.(۱) Əli ibn Əbi Talib şəhadətə çatanda Həbibin təqribən ۵۴ yaşı vardı. O təqva, isar, təcrübə və agahlıq dolu bir ömür yaşamışdı. O qalan ömrünü .də haqq yolunda imamın (ə) müdafiəsinə və dinə yardıma sərf etdi

## ƏMƏVİLƏRİN SIXINTISI DÖVRÜ

Həzrət Əlinin (ə) şəhadətindən sonra İslam cəmiyyətinin ictimai-siyasi vəziyyəti böhrana düçar oldu. İmam Həsən (ə) ölkənin siyasi səhnəsindən uzaqlaş-dırıldı. Hakimiyyət Müaviyənin əlinə keçdi. Müaviyənin iyirmi il davam etmiş diktator rejimi Əli (ə) və onun ailəsinə qarşı zəhərli təbliğatla məşğul oldu. Əhli-beyt (ə) şiələri olduqca sıxıntılı vəziyyətə düşdülər. Müaviyənin onlara qarşı siyasəti qətl, edam, həbs, sürgün, .maaşın kəsilməsi, işdən çıxarılma kimi haqsızlıqlarla müşayiət olunurdu



---

.Əyanuşşiə» ۴-cü cild, səh. ۵۵۴» [۴] -۱

Həmin bu acı dövrdə imam Həsən Müctəba (ə) Müaviyənin qurğusu ilə şəhadətə çatdı. İmam Həsəndən (ə) sonra imamət Hüseyn ibn Əliyə (ə) ötürüldü. Müaviyə isə öz çirkin siyasətini davam etdirirdi. Şiələr imam Hüseynə (ə) məktub yazır, onu Müaviyəyə qarşı qiyama çağırırdılar. Həzrət (ə) isə bu namələrin cavabında susurdu. Nəhayət, hicri ۶۰-cı .ildə Müaviyə öldü, hakimiyyət onun ləyaqətsiz və şərabxor oğlu Yezidə keçdi

Aydın məsələdir ki, həmin bu ağrılı illərdə Həbib ibn Məzahir də digər aşiq şiələr kimi, dərd-qəm içində idi. Həbib İmama (ə) itaət edir, öz ictimai-siyasi mövqeyində imamın .(ə) göstərişlərinə əsaslanırdı

Hüseyn ibn Əli (ə) Yezidə beyətdən imtina edib, Mədinədən Məkkəyə hicrət edir. İmamın Məkkədə bir neçə ay qalmasından çoxları xəbər tutur. Eləcə də, bu məsələdən xəbərdar olan Kufə şiələri Süleyman ibn Sərd Xüzainin evində məclis qururlar. Kufənin tanınmış şəxslərindən və vəfalı şiələrindən olan Süleyman məclisdəkiləri Müaviyənin ölümündən və

Yezidin canişinliyindən xəbərdar edir. O, iştirakçılara bildirir ki, imam Hüseyn (ə) Yezidə beyətdən imtina edib və Məkkəyə üz tutmuşdur. Süleyman məclisdəkilərdən imama (ə) yardım etmək istəkləri barədə soruşur və bildirir ki, əgər belə bir hazırlıq varsa, imama (ə) məktub yazıb, öz mövqeyimizi bildirək. Süleyman xəbərdarlıq edir ki, əgər belə bir hazırlıq yoxdursa, bu yola qədəm qoyulmasın.

Məclisdəkilər imamın (ə) rəhbərliyi altında döyüşməyə və haqqı müdafiə etməyə hazır idilər. Beləcə, imama (ə) məktub yazılır və İmam (ə) Yezidə qarşı mübarizəyə rəhbərlik üçün Kufəyə dəvət olunur.

İlk dəvətnaməni Kufə böyüklərindən dördü imzalayır və Məkkəyə yola salır. Bu dörd nəfər Süleyman ibn Sərd, Müsəyyib ibn Nəcbə, Rəfaə ibn Şəddad və Həbib ibn Məzahir idi. Məktubda imam (ə) Kufəyə dəvət olunur və ondan Yezidə qarşı mübarizəyə rəhbərlik etməsi istənilir.(١)



---

١- [۵] Şeyx Müfid, «İrşad», səh. ٢٠٣.

Yezid ilkin xəlifəlik dövründə vəziyyətə nəzarət etmək üçün sərt tədbirlər görürdü. Həmin şəraitdə Həbib və onun həmfikirləri tərəfin-dən belə bir məktubun yazılması çox mühüm və təhlükəli bir iş idi. Bu namənin ardınca Hüseyn ibn Əliyə (ə) bir xeyli məktublar yazıldı. Bütün bu məktublarda İmamdan (ə) yubanmadan, ilkin fürsət düşən .kimi özünü Kufəyə çatdırması istənilirdi

## HƏBİB MÜSLİMİN HƏRƏKATINDA

Kufəlilərin imama (ə) yazdığı çoxsaylı dəvət məktubları həzrəti (ə) vadar etdi ki, vəziyyəti və xalqın hazırlığını dəqiq qiymətləndirmək üçün oraya xüsusi bir nümayəndə göndərsin. İmam (ə) Kufəyə Müslim ibn Əqili göndərdi. Müslim Kufəyə gəlib İmamın (ə) naməsini xalqa oxudu və onlardan cavab gözləməyə başladı. İlk məclisdə Kufə şiələrindən olan Əbbas Şakəri alovlu bir nitq söylədi, sonra Müslim ibn Əqilə dedi: «Həmd olsun Allaha. Mən xalq haqqında

bir söz deyə bilmərəm. Çünki onların qəlblərindəkiləri bilmirəm. And olsun Allaha, mən sənə öz nəzərimi və hazırlığımı bildirirəm. Əgər çağırsa-nız, səsinizə səs verəcəyəm və sizinlə birlikdə düşmənlərinizlə vuruşacağam. Allahın görüşünə nail olana qədər sizin qarşınızda düşmənə qılınc çalacağam və bu işdə Allahdan başqa kimsədən bir şey «...gözləmirəm

Seçim məqamı çatmışdı. Hazırlığı bildirməklə yanaşı əməl də lazım idi. Əbbasın çıxışından sonra Həbib ibn Məzahir ona xitabla dedi: «Sanki bizim dilimizdən danışırsan. Allah sənə rəhmət etsin! Qəlbində olanları qısa şəkildə dedin. And olsun bir olan Allaha! (Mən də onun bəyan etdiyi əqidədəyəm». (١)

Müslim həmin günlər Muxtar Səqəfi-nin evində olurdu. İnsanlar ardıcıl şəkildə Muxtarın evinə axışıb, Müslim ibn Əqillə Hüseynə (ə) yardım haqqında beyət edirdilər. Həbib ibn



---

/Tarixe-təbəri», ٧-ci cild, səh. ٢٣٧» [۶] -١

Məzahir və Müslim ibn Ovsəcə hökumət casuslarından gizli şəkildə Müslim ibn Əqil üçün xalqdan beyət alırdılar. Onlar bütün varlıqları ilə imam Hüseynin (ə) rəhbərliyi .altında baş verəcək hərəkat üçün çalışırdılar

Kufənin yeni hakimi İbn Ziyad şəhərə gəldiyi vaxt və hökumət işlərini ələ aldıqdan sonra beyət məsələsi çətinləşdi. Həbib isə əvvəlki tək Müslimin hərəkatı yolunda səy göstərirdi. Amma vəziyyət çətinləşdik-dən sonra xalq Müslimin ətrafından dağılışmağa başladı. Bu vaxt Həbib ibn Məzahirin və Müslim ibn Ovsəcənin də tayfası bu iki şəxsi İbn-Ziyadın qəzəbindən qorumaq üçün gizlədilər.(۱) Çünki İbn-Ziyad bu hərəkatın .fəal-larını axtarıb tapır, ya zindana salır, ya da edam etdirirdi



---

/Əyanuşşiə» ۴-cü cild, səh. ۵۵۴» [۷] -۱

**KƏRBƏLA KARVANINA DOĞRU**

!?Sevgi yağışı üçün qoca nədi, cavan nə

.Şərab təsir eyləməz eşq badəsin içənə

,Aşiq gecələr oyaq, qorxutmaz onu zülmət

.Ölümdə bir qorxu yox, yaşayırsa məhəbbət

Varsa mövla sevgisi, inan, vəfadan savay

.Hər şeyi pərdələyib, məşuqçün qurar saray

İmam Hüseyn (ə) Məkkədən Kufəyə yola düşdü. Bu şəhadət karvanındakılar yalnız Allah və Onun dininin qələbəsi haqqında düşünənlər olmalı idi. Belə bir karvan Məkkədən Kərbəlaya üz tutmuşdu. Həbib ibn Məzahirin belə bir karvanda olmaması təəssüf doğurardı. Hansı ki, Məkkədən imamla (ə) birlikdə Kərbəlaya yola düşənlərin heç də hamısı sonadək imamla (ə) yoldaşlıq etmədi. Çünki bu karvana qoşulanların bir .hissəsi şəhadət yox, başqa şeylər haqqında düşünürdülər

Çox olar dilində «oldu» deyənin

.Qəlbində qopan səs «olmadı» deyər

,Karvana çoxları qoşulsalar da

.Mənzilə çatmamış yolundan dönər

İmam Hüseyn (ə) Kufəyə hərəkət zamanı bir namədə Həbib ibn Məzahirə yazır: «Əli ibn Əbi Talib oğlu Hüseyndən (ə) fəqih alim Həbib ibn Məzahirə. Ey Həbib! Sən bizim Peyğəmbərlə (s) qohumluğumuzu və yaxınlığımızı bilirsən və bizi hamıdan yaxşı tanıyırsan. Sən gözəl əxlaq və qeyrət sahibisən. Ona görə də canını bizim yolumuzda fəda etməkdən çəkinmə. Belə etsən cəddim Peyğəmbər (s) sənin işinin mükafatını (qiyamətdə əta edər».(١

Bu Həbibin üzünə gülmüş, onun qapısını döymüş bir səadət idi. Ey Həbib, müjdə olsun !sənə Allahın behişti! Bu behişt Allahın yolunda cihad və şəhadətinin mükafatıdır

Həbib ibn Məzahir və Müslim ibn Ovsəcə, bu iki şücaətli şəxs imam səh:١٩

---

.Fazil Dərbəndi, «Əsrarul-şəhadət», səh.٣٩٠ [٨] -١

Hüseynin (ə) karvanının Kufəyə yaxın-laşması xəbərini eşitdilər. Kufə əhlinin vəfasızlığı onları sarsılt-mışdı. Digər bir tərəfdən, Hüseyn ibn Əlini (ə) görmək arzusunda idilər. İmamla (ə) görüş onların qəlbini sarımışdı. Qərara gəldilər ki, özlə-rini İmama (ə) çatdırsınlar. İmam (ə) Kufəyə çatmamış Kərbəla adlanan yerdə mühasirəyə alındı. İbn Ziyadın məmur-ları vəfalı kufəlilərin İmama (ə) qoşulmaması üçün gecə-gündüz Kufə qapılarında keşik çəkirdilər. Amma bu iki qoca və vəfalı insan nə yolla olur olsun, özlərini Hüseynə (ə) çatdırmaq əzmindəydilər. Onlar gecələr yol gedir, gündüzlər dincəlirdilər. Nəhayət, məhərrəm ayının yeddinci günü Kərbəlada İmamın (ə) karvanına qoşula bildilər.(١) Artıq onlar imamla (ə) göz-gözə dayan-mışdılar. Onların baxışları qəlb-lərindəki hisslərdən danışırdı. Ürəkləri Hüseynə (ə) məhəbbət, şəhadət .eşqi ilə çırpınırdı



---

.Əyanuş-şiə», ۴-cü cild, səh.۵۵۴» [۹] -١

Həbib ibn Məzahir imam Hüseynlə (ə) görüşdüyü vaxt İmamın (ə) düşmənlə-rini çox, dostlarını isə az gördü. İmama (ə) ərz etdi: «Bu yaxınlıqda Bəni-Əsəd qəbiləsi yaşayır. Əgər icazə versəniz, onların yanına gedər və köməyə çağıraram. Olsun ki, Allah onları hidayət edə və sizin müdafiənizə qalxalar».

Hüseyn ibn Əli (ə) ona icazə verdi. Həbib tələsik özünü Bəni Əsəd qəbiləsinə çatdırdı. Onları bir yerə toplayıb moizə etdi və belə dedi: «Sizin üçün gözəl bir hədiyyə gətirmişəm. Rəhbərin öz qövmünə gətirdiyi ən yaxşı bir hədiyyə! Bu hədiyyə sizin qonşuluğunuzda dayanmış Hüseyn ibn Əli (ə), Əmirəl-möminin (ə) və Fatimənin (ə) övladıdır. Onun yanında bir dəstə mömin də var. Düşmənlər onu mühasirəyə almışlar və qətlə yetirmək fikrindədirlər. Sizi onun müdafiəsinə, peyğəmbər (ə) ehtiramının hifzinə dəvət etməyə gəlmişəm. And olsun Allaha, əgər ona yardım etsəniz, Allah dünya və axirətin şərəfini sizə verər. Mən ona görə bu məsələdə sizə üz tutmuşam ki, siz mənim qövmümsünüz və mənə ən yaxın

adamlar hesab olunursunuz». Həbibi dinləyənlər arasından Əbdüllah ibn Bəşir adlı biri qalxdı və dedi: «Ey Həbib! Allah sənin zəhmətlərinin əvəzini versin! Sən bizə insanın ən əziz adamına verdiyi iftixarı gətirmisən. Mən sənin dəvətinə «ləbbeyk» deyən ilk adam «...oluram

Başqaları da ayağa qalxdılar və Əbdüllah ibn Bəşirlə eyni fikirdə olduqlarını bildirdilər. Bəyan etdilər ki, onlar Hüseynə (ə) qoşulmağa və yardım göstərməyə hazırdırlar. Bu adamların sayı yetmişlə doxsan nəfər arasında idi. Onlar Kərbəlaya doğru hərəkət etmək qərarına gəldilər. Amma bu adamların arasında Ömər Sədin xəyanətkar bir casusu vardı. O şahid olduğu söhbətləri Ömər Sədə çatdırdı. Ömər Səd Əzrəq adlı amansız bir şəxsi beş yüz süvari ilə göndərib, onların hərəkətinin qarşı-sını aldı. Əzrəq öz ətrafındakı adam-larla birlikdə Bəni Əsəd qəbiləsinin üzərinə hücuma keçdi. Həbib ibn Məzahirin fəryadları heç bir nəticə vermədi. Bəni Əsəd qəbiləsindən olan

müsəlmanlar çoxsaylı düşmən qarşısında tab gətirmədikdən çarəsiz qalıb evlərinə .dağılışdılar

Həbib ibn Məzahir isə yenidən imam Hüseynin (ə) yanına qayıtdı. Əhvalatı olduğu kimi ona danışdı. Həzrət (ə) buyurdu: «Allah nə istəyirsə, o da olsun. Allahdan başqa bir .«qüvvə yoxdur

Bəni Əsəd qəbiləsi İmama (ə) yardım əli uzada bilməsə də, aşura hadisəsindən sonra qanlı Kərbəla meydanına gəlib cənazələri torpağa tapşırdı. İmam Səccad (ə) üzündə .niqab Kərbəla şəhidlə-rini tanıtdırır və onların dəfnində iştirak edirdi

## CƏBHƏDƏ TƏBLİĞ

Həbib ibn Məzahirin başqalarının axirət xoşbəxtliyi üçün necə çalışdı-ğını gördük. O öz söhbətləri ilə Bəni-Əsəd qəbiləsini İmam (ə) yolunda fədakarlığa hazırlayırdı. Əfsus ki, .düşmən qüvvələri onların aşura karvanına qoşulmasına mane oldu

Həbib hətta döyüş meydanında da insanlara təbliği, onların haqqa gəlib səh:٢٣

batildən uzaqlaşmasını bir an olsun belə unutmurdu. Ömər Səd Kərbəlaya çatdığı vaxt imamla (ə) danışıqlar üçün bir neçə dəfə onun yanına adam göndərdi. İmamın (ə) görüşünə göndərilən ilk adam Kəsir ibn Səd adlı alçaq bir şəxs idi. Bu şəxs imamın (ə) yoldaşları tərəfindən rədd edildi. O, İmamla (ə) görüşməzdən qabaq hətta silahını da təhvil vermək istəmirdi. Kəsir ibn Sədin rədd edildi-yini görən Ömər Səd Qurrə ibn Qeys adlı başqa birisini göndərdi. İmam Hüseyn (ə) bu şəxslə görüşməzdən qabaq Həbib ibn Məzahirdən onun haqqında soruşdu. Həbib dedi: «Bəli, onun adı Qurrədir. Anası bizim qəbilədəndir və bizə bacı oğlu hesab olunur. Mən onu əvvəllər yaxşı adam kimi tanıyırdım. İnanmırdım ki, Yezid tərəfdarlarına qoşula. O bir vaxtlar iman və təqva əhli idi. Ağlıma da gəlməzdi ki, nə vaxtsa Kufə qoşunu ilə həmkarlıq edə!» Nəhayət, Qurrə imam Hüseynin (ə) hüzuruna gəldi. O Ömər Sədin sözlərini İmama (ə) çatdırdı.

Geriyə qayıtmaq istəyərkən Həbib onu saxlayıb dedi: «Ey Qurrə! Allah sənə rəhm

etsin! Yoxsa zalımların yanına qayıdırsan? Qayıt, Hüseynə (ə) yardımçı ol. Bizim izzətimiz onun ata-babalarının bərəkətindəndir». Qurrə dedi: «Hüseynin (ə) cavabını .çatdırdıqdan sonra bu barədə düşünəcəyəm».(١) Amma Qurrə geri qayıt-madı

Həbibin düşmən qoşununa ikinci moizəsi məhərrəm ayının doqquzuncu günü günortadan sonra oldu. Həmin gün Ömər Səd qoşunundan böyük bir dəstə imamın (ə) ordugahına hücum etdi. İmam qardaşı Əbbasa göstəriş verdi ki, hücum edənlərin niyyətindən xəbər tutsun. Əbbas iyirmi nəfər süvari, eləcə də Həbib və Züheyrlə birlikdə onların qabağına çıxdı. Əbbas soruş-du: «Nə olub və nə istəyirsiniz?» Dedilər: «Übeydullah Ziyad əmr etmişdir ki, ya müharibə olmalıdır, ya da qeyd-şərtsiz təslimçilik». Əbbas dedi: «Tələsməyin, mən Əba-Əbdillah Hüseyndən (ə) fikrini öyrənim». Əbbas tələsik Hüseynin (ə) yanına qayıtdı. Bu arada düşmən döyüşçüləri ilə üzbəüz



---

.Tarixe-Təbəri, ٧-ci cild, səh.٣١٠ [١٠]-١

dayanmış Hüseyn (ə) tərəfdarları onlarla söhbətə başladı. Həbib ibn Məzahir Züheyrə dedi: «Əgər istəyirsənsə, onlarla söhbət et». Züheyr dedi: «Təklifi sən etdin, özün də söhbətə başla». Həbib üzünü onlara tutub dedi: «And olsun Allaha! Peyğəmbər övladlarını, abid bəndələri, Allahı zikr edənləri qətlə yetirənlər qiyamət günü Allahla (üzbəüz dayanarkən necə də pis olacaqlar».(١

Həbibin bu sözlərini yatmış vicdan-ları oyadacağından qorxan biri onun sözünü kəsib .«dedi: «Həbib, yetər! Sən özünü bacardıqca tərif etdin

Züheyr həmin şəxsin cavabını dərhal verdi. Nəhayət, belə qərara gəldilər ki, sabah sübhədək döyüşü təxirə salsınlar.(٢) Həbib və imamın (ə) digər yaxınları bu son nurani .gecədə dua və ibadətə məşğul oldular



---

.Tarix-Təbəri, ٧-ci cild, səh.٣١٨ [١١] -١

.Məqtəlul-Hüseyn (ə)» səh. ٢۵۶» [١٢] -٢

Həmin gecə həyatdan hərə öz mənəvi azuqəsini götürürdü. Hüseyn ibn Əli (ə) tək-tənha xeymədən çıxdı ki, xeymələrin arxasındakı vəziyyəti öyrənsin. Bu vaxt yaxınlarından biri olan Nafenin də onun ardınca gəldiyini gördü. İmam soruşdu: «Kimdir? Nafe sənsən?» Nafe ibn Hilal cavab verdi: «Bəli, mənəm, fədan olum, ey peyğəmbər övladı». İmam soruşdu: «Bu gecə vaxtı çölə çıxmağının səbəbi nədir?» Nafe cavab verdi: «Ey mənim ağam! Gecə vaxtı sizin İbn-Ziyada doğru hərəkət etməyiniz məni narahat etdi». İmam (ə) buyurdu: «Mən bayıra çıxdım ki, bunların eniş-yoxuşunu öyrənim. Bilmək istədim ki, arxadan düşmənin həmləsi üçün pusqu varmı?»

İmam (ə) Nafenin sol əlini əlinə alıb buyurdu: «Özüdür! And olsun Allaha ki, bu həmin dəyişməz vəddir!» (İmam (ə) öz şəhadətinə işarə edirdi). Sonra Nafeyə dedi: «Ey Nafe! Bu dağların arasından bir yol tap, özünü xilas et». Nafe dedi: «Ey mənim ağam! Əgər belə etsəm, anam əzamda ağalasın! And olsun Allaha, boyun

«...damarlarım kəsilənədək sizdən ayrılmaram

İmam (ə) Nafedən ayrılıb, bacısı Zeynəbin xeyməsinə getdi. Nafe isə dayanıb imamı (ə) gözləyirdi. Zeynəb qardaşına dedi: «Öz yaxınlarının batinindən əminsənmi ki, çətinlik vaxtı nizələr səni tapmayacaq?» İmam (ə) buyurdu: «Bəli, bacım! Onların hər biri şəhadət eşqində olan cəsur insandır. Uşaq anasının südünə müştaq olduğu tək onlar .«da şəhadət eşqindədirlər

Hüseynlə (ə) Zeynəbin söhbətini eşidən Nafe tələsik Həbib ibn Məzahirin yanına gəldi və eşitdiklərini ona danışdı. Həbib ibn Məzahir dedi: «And olsun Allaha! Əgər İmamın (ə) istəyinə zidd olmasaydı, elə bu an qılınc çəkib düşmənin üstünə gedərdim». Nafe dedi: «Qardaşım! Peyğəmbər qızlarını iztirab halında qoymuşuq. Dur, o biri səhabələri də götürüb, onların hüzuruna gedək və onları arxayın edib, qorxularını aradan qaldıraq». Həbib ibn Məzahir öz döyüş yoldaşlarını həmin müqəddəs gecədə belə səslədi: «Allahın (və Peyğəmbərin (s

ənsarı haradadır? Fatimənin ənsarı, İslamın dostları, Hüseynin (ə) səhabələri «?haradadır

Сəhабәләр шир тәк тәләсик хејмәләрдән чыхдылар. Әббас ибн Әли (ә) дә онларын арасында иди. Һәбибин истәји илә Әббас вә Бәни-Һашимдән олан фәрдләр хејмәләрә гајытдылар. Һәбиб дикәр сәhабәләрлә галды. Сонра Һәбиб ибн Мәзаhир һәмин гәhрәманлара үз тутуб, Нафедән ешитдик-ләрини деди. Бунунла о дүшәркәдәкиләрин һазырлығыны билмәк истәди. Сәhабәләр гылынҹларыны чәкиб дедиләр: «Һәбиб! Анд олсун Аллаhа, әкәр дүшмән бизә доғру һәрәкәт етсә, онларын башларыны бәдәнин-дән ајырыб, өз бөјүкләринә говушдураҹағыг вә Пејғәмбәр (с) аиләсинин кешијиндә дајанаҹағыг». Һәбиб деди: «Онда кәлин Пејғәмбәр (с) һәрәминә доғру кедәк вә онларын горхусуну арадан галдыраг». Онлар хејмәләрә јахынлашдылар. Һәбиб деди: «Салам олсун сизә, еј бизим ағаларымыз! Салам олсун сизә, еј Пејғәмбәр аиләси! Бу ҹаванлар анд ичмишләр ки, гылынҹларыны дүшмәнин бојнуна гојанадәк гынына гајтармасынлар. Бу гуламлар да анд

ичмишләр ки, низәләрини сизин нида едәнләринизи пәракәндә саланларын синәсинә отуртмајынҹа кәнара гојмајаҹаглар».

Bu vaxt Hüseyn ibn Əli (ə) bayıra çıxdı. Onların isar və fədakarlığı müqabilində təşəkkür edərək buyurdu: «Ey mənim səhabələrim! Allah-təala Peyğəmbərinizin (s) Əhli-beyti tərəfdən sizə ən yaxşı mükafatı versin!»(1)

İmamın (ə) ətrafındakılar yaxşı bilirdilər ki, bu son gecənin dəyərli anları onları əbədiyyətə qovuşduracaq ən qiymətli sərmayələridir. Misilsiz dəyərlərə malik olan bir gecə! Vay olsun o insana ki, öz həyatının qədr gecəsini tanımaz! Hüseynin yardımçıları bu aşura gecəsinin dəyərini necə də gözəl bilirdilər!

Beyətlər öhdədən düşdü bu gecə,

Məşuq aşiqlərə «gedin» söylədi.

Həbib fəryad edib dedi: ey ağa,

Sənsiz mən kiməm ki, varlığım nədi?



---

1- [13] «Tarixe-Təbəri», 7-ci cild, səh. 329.

,Saçlar ağarsa da, könül cavandı

.Həbib əvvəlki tək qana qan dedi

Başqa cür ola da bilməzdi! Həbib Seyyidüş-şühədanı tək qoymuş olsaydı, könüllərdə .yer tapmaz, adı əbədiləşməzdi

## ŞƏHADƏT ŞÖVQÜ

Pir olub, taqətdən düşsə də canım

.Cavan aşiqlərlə birdir ünvanım

,Bu səhra şahiddir mənim eşqimə

!Soruşma ürəyim çırpınır niyə

Bu bir şüar yox, həqiqətdir. Ölüm üçün şadlıq, şəhadət şövqü! İnsan özü ilə Allah, behişt, Peyğəmbər (s) və imamlar (ə), siddiqlər və şəhidlər arasında bir gecəlik fasilə görən vaxt bu səfərin necəliyindən xəbərdar ola-ola necə sevinməyə bilər?! Şəhadət sevinci o insanlara xasdır ki, ilahi agahlığa, «elmül-yəqinə» çatmış olsunlar. Həbib ibn Məzahir belə insanlardan idi. İmam Hüseyn (ə) səhabələri peyğəmbər səh:٣١

yadigarlarının qarşısında, Allah yolunda şəhadətə yetişəcəklərini bildikləri vaxt şadlanır, zarafatlaşırdılar. Həbib ibn Məzahir üzündə təbəssüm, sevincək halda səhabələrin yanına getdi. Yezid ibn Həsin Təmimi adlı səhabə bu şadlığa etiraz edərək dedi: «Məgər indi zarafat, gülmək vaxtıdırmı?!» Həbib ibn Məzahir dərin bir imandan danışan cavab verdi: «Sevinib-şadlanmaq üçün bundan da yaxşı vaxt olacaqmı?! And olsun Allaha, bir şey qalmayıb ki, o azğınların qılıncları bizi doğrasın və behişt hurul-eyninə qovuşaq».(۱)

Şadlığından özünə sığmayan, deyib-gülən digər bir səhabəyə təəccüblə dedilər: «Axı indi boş işə vaxt sərf etməzlər». O belə cavab verdi: «Yaxınlarım yaxşı bilirlər ki, mən nə gəncliyimdə və nə də qocalığımda boş şeylərə vaxt sərf etməmişəm. Amma qarşıdakı görüş məni sevindirir. Behiştlə bizim aramızda düşmən qılınclarının sıyrılması qədər

səh:۳۲

---

۱- [۱۴] «Rical keşi», səh.۵۳.

«vaxt qalır».(1)

Belə bir şəhadət eşqi harada görünüb?! Yalnız və yalnız ilahi məktəblərdə, din alimlərinin təlimləri sayəsində aşiqlərin baxış üfüq-ləri bir bu qədər genişlənir, dərinləşir və işıqlanır! Müqəddəs müdafiənin nurani cəbhələ-rində İslam mücahidlərinin ruhiyyəsi yada düşür. Bu insanları ruhlandıran, şübhəsiz ki, Kərbəla dastanı idi və bu mücahidlər Hüseyn (ə) aşura məktəbinin şagirdləri idilər.

## AŞURA QƏHRƏMANLIQ GÜNÜ

Aşura günü sübh namazından sonra İmamın (ə) düşərgəsində ciddi hazırlıq nəzərə çarpırdı. Hüseyn ibn Əli (ə) öz qüvvələrinin hərbi hazırlığı ilə məşğul idi. Həzrət (ə) Həbib ibn Məzahiri sol cinahdakı qüvvələrin, Züheyri sağ cinahdakı qüvvələrin koman-danı təyin etdi. İmamın (ə) qüvvələri az saylı olsa da, bir dünya əzəmət, şücaət və



---

1- [15] «Həyatil-imaməl-Hüseyn», 3-cü cild, səh. 176.

imana malik idilər. Həbib ibn Məzahir imamın (ə) ən dəyərli səhabələrindən idi. Hərbi həmlələr vaxtı meydanda olan hər bir kəs onu səsləyir və onun çağırışına dərhal cavab verirdi. Bir dəfə də Ziyadın qulamı Salim və Übeydullahın qulamı Yəssar meydana çıxıb, mübariz tələb etdilər. Yəssar meydanda təkəbbürlə dayanıb ya Həbib, ya Züheyr, ya da Bureyr ilə döyüşəcəyini elan etdi. Həbib və Bureyr dərhal yerlərindən qalxdılar. Amma imam (ə) onlara icazə vermədi və Əbdullah ibn Əmiri meydandakı düşmənlə döyüşə göndərdi. Əbdüllah meydandakı düşmən-lərin hər ikisini həlak etdi.(١)

Həbib bütün səhnələrdə iştirak edir, imamın müdafiəsində, cəbhənin güc-ləndirilməsində qılıncı, dili, nitqi ilə öz vəzifəsini yerinə yetirirdi. Həmin aşura səhəri imam Hüseyn (ə) düşməni düzgün yola dəvət etmək və höccəti tamamlaq, bəhanələri aradan qaldırmaq üçün öz əzəmətli nitqini söylədi. Həzrət buyurdu: «Mənim əslimi nəzərdə saxlayın



---

١- [١۶] «Tarix-Təbəri», ٧-cild, səh. ٣٣۶.

və baxın ki, məni öldürmək sizin xeyirinizədirmi? Məgər mən Peyğəmbərin qızının oğlu
«...?deyiləmmi

.«Şimr Həzrətin (ə) sözünü kəsdi və dedi: «O (yəni imam (ə)) Allaha sözdə pərəstiş edir

Həbibin dini qeyrəti ona bu səhnələri sakitcə seyr etməyə imkan vermədi və o Şimrə cavab verdi: «And olsun Allaha! Görürəm ki, sən Allaha yetmiş dillə pərəstiş edirsən. (Həbib Şimrin saxta etiqadına işarə edirdi). Mən də şahidəm ki, dediyin kimi, imamın (ə) sözlərini anlamırsan. Allah sənin qəlbini möhürləyib və həqiqəti dərk etməkdən .məhrumsan.»(١) Beləcə, Şimr susdu və İmam (ə) öz sözünə davam etdi

Üzbəüz döyüş başladı. İmamın fədakar köməkçiləri həmin tarixi məqamda birbəbir cihada gedir və qanlı savaşlardan sonra şəhadətə çatırdılar. Həbibin yaxın dostu olan Müslim ibn Ovsəcə meydana çıxdı, qəhrəmanlıqla döyüşüb, nəhayət, yerə yıxıldı. O, qanına



---

.Tarixe-Təbəri», ٧-ci cild, səh. ٣٢٩» [١٧] -١

qəltan olduğu vaxt Hüseyn ibn Əli (ə) və Həbib ibn Məzahir ona yetişdi. Müslim son nəfəslərini dərərkən Həbib ona dedi: «Müslim, mənim üçün sənin ölümün çox ağırdır! Səni behiştlə müjdələyirəm». Müslim zəif bir səslə dedi: «Allah sənə behişti müjdə etsin!» Sonra Həbib əlavə etdi: «Müslim, əgər səndən sonra qətlə yetirilməmiş olsaydım, vəsiyyətlərini eşitmək istəyərdim. Çünki mənim boynumda yaxınlıq və din haqqın var». Müslim ibn Ovsəcə çətinliklə danışa bilirdi. O dedi: «Sənə vəsiyyət edirəm ki, ölüm anınadək bu insanla (imam Hüseynlə (ə)) ol və onunla çiyin-çiyinə döyüş!» Həbib dedi: «And olsun Kəbənin Allahına! Elə də edəcəyəm».(۱) Həbibin bu sözlərindən sonra .Müslim gözlərini əbədi olaraq dünyaya qapadı

Bu iki dostun vəfadarlığı onları Kərbəla şəhidləri zümrəsinə daxil etdi. Xatirələri əziz !olsun

.Aşura günü günorta imam Hüseyn (ə) son namazını qılmaq üçün möhlət istədi



---

.Əyanuş-şiə», ۴-ci cild, səh. ۵۵۵» [۱۸] -۱

Düşmənin xəbis döyüşçülərindən olan Həsin ibn Təmim fəryad edərək dedi: «Hüseyn, sənin ki namazın qəbul deyil!» Bu sözlər Həbib ibn Məzahiri qəzəbləndirdi və o dedi: «Yoxsa güman edirsən ki, Peyğəmbərin qıldığı namaz qəbul deyil, sənin qıldığın namaz qəbuldur, ey ulağ?!» Sonra onlar bir-birlərinə hücum etdilər. Həbib ibn Məzahir qılıncla vurub, Həsinin atını yıxdı və Həsin yerə sərildi. Düşmənlər Həsini Həbibin əlindən aldılar. Həbib onlara xitabən dedi: «Ey ad və güc cəhətdən ən alçaq qövm, and içirəm ki, biz sizin qədər və ya bir az ondan az olsaydıq, qılınclarımızın xofundan qaçıb, meydanı boş qoyardınız».

Həbib ibn Məzahirin son fədakarlıq anı çatdı. Damarlarından gənc qanı axan bu qoca mücahid qılıncını çəkib, düşmənlərə hücum etdi. Döyüş meydanı onun əzəmətindən təlatümə gəldi. Həbib düşmən qoşununu yara-yara belə bir rəcəz oxuyurdu:

Mən Məzahir oğlu Həbibəm, bilin,

Hünəriniz varsa, meydana gəlin.

,Sayınız olsa da bizlərdən artıq

.Qəlbimizdə vəfa, başımız ayıq

,Dəlilimiz möhkəm, sözümüz aşkar

.Candan keçiləsi məqsədimiz var

Həbib ibn Məzahir yaşının ötməsinə baxmayaraq, şücaətlə vuruşur, düşmənə aman vermirdi. O, ۶۲ düşmən döyüşçüsünü qılıncdan keçirdi. Nəhayət, başının ortasından dəyən qılınc və düşmən nizəsi onu yerə yıxdı. Bir qədər əvvəl Həbibin əlindən zorla qurtulmuş Həsin ayağa qalxmaq istəyən Həbibə hücum edib, qılınc zərbəsi ilə onu yenidən yerə yıxdı. Həbibin ağ saçları al qana boyanmışdı. O, döyüş səhnəsini görmək üçün gözlərini tutmuş qanı silmək istədi. Bu vaxt düşmən nizəsi onu hədəfə aldı. Axır anlarını yaşayan Həbib haqq yolda can vermək, həqiqət və din ağacını öz qanı ilə .suvarmaq həsrətində idi

Həbibə son zərbəni vurmuş Bədil ibn Sərim atdan düşüb, özünü Həbibə

(çatdırdı və tələsik onun başını bədənindən ayırdı.(١)

Həbibin şəhadət dağı Hüseynin (ə) dostlarına çox ağır gəldi. Hüseyn (ə) özünü Həbibə çatdırdı ki, onu şəhadəti, məşuq hüzuruna meracı münasibəti ilə təbrik etsin. Həbibin şəhadətinin təsirindən imam (ə) buyurdu: «Özümün və məni himayə edən dostların (Allahdan mükafatı intizarındayam».(٢)

!Allahın və Onun rəsulunun salamı olsun Həbib ibn Məzahir Əsədiyə



---

.Tarixe-Təbəri», ٧-ci cild, səh. ٣۴٨» [١٩] -١

.Əyanuş-şiə», ۴-ci cild, səh. ۵۵۵» [٢٠] -٢

**MÜNDƏRİCAT**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

